AcademyGate Publishing
p-ISSN 2790-0029; e-ISSN 2790-0037

# “PEYĞƏMBƏRİN HƏYATI (I CİLD)” KİTABI HAQQINDA

**Mehrab Dəmirzadə**[1]

**UOT:** 929.; 02.
**KBT:** 91.9: 78; 78;
**HoS:** 43
**DOI:** 10.33864/2790-0037.2024.v5.i4.99-102




**Kitabın adı:** Peyğəmbərin həyatı (I cild)
**Müəllif:** Məhəmməd Qəzali
**Kitabın dili:** Ərəb
**Tərcümə edən:** Elvüsal Məmmədov
**Nəşr ili:** 2015
**Səhifəsi:** 408
**Nəşriyyat:** İdrak İctimai Birliyi
**Ölkə:** Azərbaycan
**ISBN:** 978-9952-484-99-1

---

[1]. Magistrant, İslamşünaslıq ixtisası, Azərbaycan İlahiyyat İnstitutu; Bakı, Azərbaycan
E-mail: demirzadeh.mehrab@gmail.com
https://orcid.org/0000-0001-7955-0790
**Məqaləyə istinad:** Dəmirzadə, M. [2024]. “Peyğəmbərin Həyatı (I Cild)” Kitabı Haqqında. *History of Science jurnalı, 5(4),* səh.99-102.
https://doi.org/10.33864/2790-0037.2024.v5.i4.99-102

**Məqalənin tarixçəsi:**
*Məqalə redaksiyaya daxil olmuşdur: 09.09.2023*
*Təkrar işlənməyə göndərilmişdir: 15.01.2024*
*Çapa qəbul edilmişdir: 27.09.2024*

### *1.Mövzunun əhəmiyyəti və kitabın yazılmasındakı məqsəd*

Həzrət Muhəmməd Peyğəmbər (s.ə.a.s) İslam dini inancına görə Xatəmul-ənbiya, yəni peyğəmbərlərin sonuncusu və vəhy olaraq müqəddəs Qurani-Kərim kitabı ilə gələn şəxsdir. Dinin təbliğ edilməsi və yayılmasında müstəsna rolu olmaqla bərabər, həm də dini ən gözəl şəkildə həyatına tətbiq edərək yaşamış nümunədir. Ona görə də Peyğəmbərin (s) həyatı və necə yaşaması İslam dininə inanan şəxslər üçün əhəmiyyətli olmuş, hər dövrdə bu müqəddəs insandan örnəklər alınmış, müsəlmanlar da ona bənzəməyə çalışmışlar. Ona görə də bu dini anlamaq üçün Peyğəmbərin (s) mübarək həyatı öyrənilməli və araşdırılmalıdır.

"Peyğəmbərin həyatı (I cild)" kitabında da əziz İslam peyğəmbəri Həzrət Muhəmməddən (s) və onun həyatından bəhs olunur. Ərəbistan yarımadasında zühur edib Azərbaycan da daxil olmaqla Çindən İspaniyaya qədər geniş əraziyə yayılan və hazırda mənsublarının sayı 2 milyarda çatan İslam dininin peyğəmbəri olduğunu nəzərə alsaq, bu insanın şəxsiyyəti və mübarizəsinin tədqiq edilməsi bizim üçün əhəmiyyət kəsb edir. Kitabın yazılmasında əsas məqsəd böyük bir mədəniyyətin əsasını qoymuş şəxsin həyatınının anlaşılması və qiymətləndirilməsidir. Bunu müəllif özü Ön söz qismində belə qeyd edir:

"Bunu ona görə etmişəm ki, Peyğəmbərin həyatı – "sirə" imanı gücləndirsin, əxlaqı gözəlləşdirsin, mübarizliyi artırsın, haqqın qəbul edilib qorunmasına həvəs oyatsın, bütün bunlara dair misilsiz misalları özündə ehtiva etsin".

### *2.Müəllif haqqında qısa məlumat*

Məhəmməd əl-Qəzali ərəb əsilli İslam alimi və mütəfəkkiridir. O, "əs-Sünnətün-Nəbəviyyə bəynə Əhlil-fiqh və Əhlil-hədis" (1984), "Fiqhus-Sirə" (1989), "Huququl-İslam" (1989) kimi əsərləri ilə tanınır. Qəzali 1917-ci ildə Misirdə dünyaya gəlmiş, 10 yaşında Quranı əzbərləmişdir. Dini təhsilini isə məşhur "əl-Əzhər" universitetində almışdır. 1937-ci ildə Əzhəri-Şərifin "Üsul əd-din" (Dinin əsasları) fakültəsinə daxil olmuşdur. Dövrün ziyalı alimlərindən dərs almışdır. Universitetdə oxuyarkən məqalələr yazmış və akademik mətbuatda çap etdirmişdir.

Qurani-Kərim və Quran elmlərinə marağı güclü olmuş, bu sahəni dərindən öyrənmişdir, o cümlədən Şərq və Qərb fəlsəfəsi, iqtisadiyyat, sosiologiya, sənətşünaslıq kimi sahələrlə də maraqlanmışdır.

Uzun müddət Din işləri və Vəqflər Nazirliyində çalışmış, Səudiyyə Ərəbistanı, Qətər və Əlcəzair kimi ölkələrdəki universitetklərdə elmi fəaliyyətlə məşğul olmuşdur. Bir çox universitetdə isə dini çıxışlar etmişdir. Əllidən çox əsər yazmış, fəaliyyətlərinə görə bir çox mükafatlar da almışdır.

Məhəmməd Qəzali 1996-cı ildə Ərəbistanda ər-Riyad şəhərində dünyasını dəyişmiş və Bəqi qəbiristanlığında dəfn edilmişdir.

### *3.Kitabın təsviri*

Kitab Peyğəmbərdən (s) əvvəlki vəziyyəti izah etməkdən tutmuş Mədinə dövründə Qureyşlə hərbi toqquşmalara qədər baş verən hadisələri əhatə edir. Əsər özü 2 (iki) cilddən ibarətdir. Mən sadəcə birinci cildə fikir bildirmişəm. Kitabın 6 (altı) fəsli vardır: "Peyğəmbərlik və İmam"; "Doğuluşdan peyğəmbərliyədək"; "Dəvət cihadı"; "Hicrət: Müdəqqəm şərtləri və nəticələri"; "Yeni cəmiyyətin qurulması" və "Qanlı mübarizə".

Orojinal dili ərəbcə olan Azərbaycan dilinə tərcümə olunmuş bu kitab 2015-ci ildə İdrak İctimai Birliyi tərəfindən nəşr edilmişdir. İndi isə 6 fəsil olan kitabın fəsillərinə nəzər salaq:

#### *3.1.I Fəsil*

Bu fəsildə qədim mədəniyyətlərdə və cəmiyyətlərdə bütpərəstlik düşüncələri, son peyğəmbər olacaq şəxsin xüsusiyyətləri, ərəblərin həmin dövrdəki vəziyyəti, Quran-Sünnə

və Peyğəmbərin (s) başına gələn qeyri-adi hadisələrdən bəhs olunur. Müəllif bütpərəstliyin qədim dövrlərdə necə tüğyan etməsindən və peyğəmbərlərin insanları haqqa dəvət etməsinə baxmayaraq insanların çaşbaş qalmasından nümunələr verir. Həqiqətən də tarixin səhifələrini azca vərəqləyərək bunları görə bilərik. İran, Hindistan, Çin kimi müxtəlif ərazilərdə bütpərəstliyin yayıldığını bilirik. Allahın elçiləri də ilahi həqiqətləri zamanla insanlara çatdırsa da sonralar şirk bu həqiqətlərə sirayət etmiş və tövhidə qarışmış şirk meydana çıxmışdır. Haqqı tanıyan az qisimdən başqa insanların çoxu ilahi həqiqətlərdən uzaq qalmışdılar.

"Son peyğəmbərliyin xüsusiyyətləri" başlığında peyğəmbərin göndərilməsinə ehtiyyacın olmasının, onun şəxsiyyətinin əhəmiyyətinin sadə və aydın şəkildə izah edildiyinin şahidi oluruq. "Ərəblər peyğəmbərin göndərildiyi dövrdə" başlığında isə Allah Rəsulunun yaşadığı əsrdə (VII) insanalrın dünyagörüşünə, elmi vəziyyətlərinə toxunulur, cəmiyyyətdə üstünlüyün meyarının nə olması vurğulanır. Lakin bu fəsildə ərəb cəmiyyətinin ancaq acınacaqlı halı önə çəkilmiş, müsbət cəhətlərinə isə toxunulmur. İnsanların nəfsi istəklərinin qurbanı olmasından, şəhvətə aldanmaları, Allahı və axirəti inkar etmələri, var-dövlət və cəh-cəlal ardınca qaçmaları, dünyaya alüdəlik, qəbilə təəssübkeşliyi və bunun doğurduğu qəbilələrarası müharibələr, lovğalığın, təkəbbürün zirvəyə çatmasından söz edilir. Bir sözlə insanların zəlalət içində olmasına vurğu edilir. Əlbəttə bunlar həqiqətdir, amma əhali tamamilə belə idi və heç bir müsbət cəhət yox idi də deyə bilmərik. Həmin cəmiyyətdə şeir və ədəbiyyatın inkişafını, hərbi cəhətdən təcrübələrinin olmasını, Hənif dininə mənsub olan, Tək Allaha inanan bəzi şəxslərin var olduğunu da qeyd etmək olardı.

### *3.2. II Fəsil*

Bu fəsildə Peyğəmbərin (s) uşaqlığından, səfərə çıxması və rahib Bəhira ilə görüşməsindən, çətin dövrlərdən keçməsindən, gəncliyi və ailə qurmasından, Hira mağarasına getməsindən, ilk vəhyin nazil olmasından söhbət açılır. "Sinənin yarılması" başlığında Peyğəmbərimizin (s.ə.a.s) qəlbinin yuyulması təsvir edilir və hədislərdən nümunələr də verilir. Köksün əslində təkcə uşaqlıqda deyil, Allah Rəsulu (s) yaşa dolduqdan sonra yenidən baş verdiyini göstərir. Onu da qeyd edək ki, bu məsələdəki zidiyyətli məqamlara tam aydınlıq gətirilməyib. Çünki kitabın müraciət etdiyi hədislərin əksəriyyəti zəifdir. Düzdür, müəllif belə hədislərə müraciət etməsinin səbəbini əsərin əvvəlində izah edir, amma yenə də mənbələrin zəif olması kitabın nöqsanlı tərəfi kimi qəbul edilə bilər. Həm də belə düşünülə bilər ki, demək Peyğəmbərin (s) qəlbi çirklənmiş, mənfi şeylərlə dolmuşdur ki, təmizlənməyə də ehtiyyac olmuşdur. "Rahib Bəhira" adlı başlıqda da balaca Muhəmmədin (s) 12 və ya 13 yaşı olarkən əmisi ilə Şama səfər etməsindən bəhs olunur. Burada xristian rahiblə qarşılaşır və o da Muhəmmədin (s) sonuncu peyğəmbər olacağını hiss edir. Bu hədis bir çox mənbələrdə keçir. Lakin müəllif mühəqqiq alimlərin bu əhvalatın uydurma olduğunu dediklərini yazır. Maraqlısı budur ki, həmin alimlərdən heç olmasa birinin adını qeyd etmir, bu da insanda şübhə doğurur.

Bu fəsildə ərəb cəmiyyətində olan bəzi müsbət xüsusiyyətlərə və hadisələrə də toxunulur.

### *3.3.III Fəsil*

Üçüncü fəsildə Həzrət Peyğəmbərin (s) ilk dəvətindən, İslamı qəbul edənlərdən, Həbəşistana hicrtələrdən, baykot və hüzn ilindən, İsra və Meracdan, namazın vacib edilməsindən və s. əhəmiyyətli hadisələrdən danışılır. Mədinə şəhərinə köç edilənə kimi olan çətinliklər, Peyğəmbərə (s) və səhabələrinə edilən zülm, Allah Rəsulunun (s) sevimli həyat yoldaşını və himayəçi əmisini itirməsi, müsəlmanların din yolunda apardığı mübarizə gözəl bir şəkildə təsvir edilmişdir.

### *3.4.IV, V və VI Fəsillər*

Bu fəsillərdə Mədinəyə hicrət, Allah Rəsulunun (s.ə.a.s) hər kəsi yola salıb axırda Əbu Bəkrlə birgə yola çıxması, təqibçilərdən necə qurtulması, baş verən möcüzələr,

müsəlmanların şəhərə çatması və məskən salmaqları, ilk məscidin tikilməsi, ənsar və mühacirlər arasında qardaşlıq əqdinin bağlanması, qeyri-müsəlman əhali ilə münasibətlər, Peyğəmbərin (s) dövlət başçısı kimi nümunəvi şəxsiyyəti, Qureyşlə olan qanlı mübarizələr, qəzvə və səriyyələr, yahudilərlə müsəlmanlar arasında sülhün pozulması, müşriklərlə olan müharibələr ələ alınıb.

***4.Qiymətləndirmə***

Beləliklə, əsərin sadə dildə və maraqlı üslübda yazıldığını, lakin bəzi nöqsanlı məqamların olduğunu deyə bilərik. Bəzi mövzu və hadisələrə yenidən baxılmasına ehtiyyacın olduğunu düşünürəm.

***5.Nəticə***

Nəticə olaraq deyə bilərik ki, əsər yaxşı yazılıb, çox əhəmiyyətli məqamlara və mövzulara toxunulub. Bir çox hadisələr aydın və açıq şəkildə təsvir olunub. Lakin müsbət cəhətləri ilə bərabər mənfi cəhətləri də vardır. Əsərdə bəzi nöqsanlar və qaranlıq məqamlar vardır ki, onlar yuxarıda qeyd edilmişdir. Çox güman bu problem zəif hədislərdən və müəllifin diqqətsizliyindən meydana gəlmişdir. Ümumi olaraq əsərin yazılmasındakı məqsədi də nəzərə alsaq, Peyğəmbərimizin (s) həyatına yönələn yeni yanaşmaları və izahları müsbət dəyərləndirmək olar.